**Jurnal 24 may 1991-ci il tarixdə Azərbaycan Respublikası Mətbuat Komitəsində qeydiyyatdan keçmişdir (şəhadətnamə № 307)**

***(1953-cü ildən nəşr edilir)***

**PEDAQOJİ UNİVERSİTETİN XƏBƏRLƏRİ**

***Humanitar, ictimai və pedaqoji-psixoloji elmlər seriyası*, 2017, C. 65, № 3**

# MÜNDƏRİCAT

## *Humanitar elmlər*



## *İctimai elmlər*

## *Pedaqoji-psixoloji elmlər*

# СОДЕРЖАНИЕ

## *Гуманитарные науки*



## *Общественные науки*

## *Педагогико-психологические науки*

# TABLE OF CONTENTS

## Humanitarian sciences



## Social sciences

## *Pedagogical-psychological sciences*

***UOT 94''191***

***E.R.Nəciyev***
*AMEA A.Bakıxanov adına Tarix İnstitutu*
*elnurneciyev@gmail.com*

# SƏFƏVİLƏR DÖVLƏTİNİN XƏZƏRYANI ŞƏHƏRLƏRİNİN ƏHALİSİ

***Açar sözlər:*** *Səfəvilər, osmanlılar, Xəzəryanı şəhərlər, əhali, məskunlaşdırılma, say dinamikası*

Məqalədə Azərbaycan Səfəvilər dövlətinin Xəzəryanı şəhərlər və ətrafının əhalisinin say dinamikası, etnik və dini tərkibi bəylərbəyilik və məhəlli əmirliklər üzrə tədqiq edilmişdir. Aparılan tədqiqatın yekununda məlum olur ki, Xəzərin sahil xətlərinin təxminən 1700 km-i Səfəvilərin nəzarəti altında olub Şirvan, Təbriz, Astrabad bəylərbəyilikləri, Gilan və Mazandaran məhəlli əmirlikləri tərkibinə daxil idi Xəzərsahili boyu ərazilər dini tərkib baxımdan əsasən müsəlman əhalidən ibarət idi. Dərbənddən Astrabada qədər olan ərazidə etnik tərkibinə görə daha çox türk mənşəli əhalinin, onlarla yanaşı tatlar, talışlar, giləklər, mazandaranlılar, hətta sonradan məskunlaşdırılan gürcü və çərkəzlər də yaşayırdı.

***Э.Р.Наджиев***

# НАСЕЛЕНИЯ ПРИКАСПИЙСКИХ ГОРОДОВ ГОСУДАРСТВА СЕФЕВИДОВ

***Ключевые слова:*** *Сефевиды, оттоманы, прикаспийские города, население, переселение, динамика численности.*

В статье изучена динамика численности, этнический и религиозный состав населения прикаспийских городов Азербайджанского государства Сефевидов по бейлербейство и местного эмиратство. В итоге исследования было установлено, что около 1700 км береговой линии Каспийского моря был под руководством Сефевидов и входил в состав бейлербейств Ширван, Тебриз, Астрабад и местных эмиратств Гилян и Мазендеран. По религиозному составу Прикаспийские земли в основном было мусульманское население. По этническому составу от Дербента до Астрабада жили в основном населения тюркского происхождения, вместе с ними таты, талыши, гиляки, мазендеранцы, а также позднее переселенные грузины и черкесы.

***E.R.Najiyev***

## THE POPULATION OF THE CASPIAN CITIES OF THE SAFAVID STATE

***Keywords:*** *Safavids, Ottomans, Caspian cities, population, resettlement, the dynamics of number.*

The article examines the dynamics of number, ethnic and religious composition of the population of the Caspian cities of Azerbaijani Safavid State by beglerbegis and the local emirates. As a result of the study, it was established that about 1,700 km of the Caspian Sea coast was under the Safavids rule and was part of the Shirvan, Tabriz, Astrabad beglerbegis, Gilan and Mazandaran local emirates. According to the religious composition on the Caspian lands lived mainly Muslims. Ethnic composition from Derbent to Astrabad was inhabited chiefly by the population of Turkic origin, with them Tats, Talyshs, Gilaks, Mazanderanis and also later resettled Georgians and Circassians.

1501-ci ildə yaranmış Azərbaycan Səfəvilər dövləti 1508-ci ildə indiki İran ərazisini (Xorasan istisna olmaqla) tutmaqla cənub [6, s.51], 1509-cu ildə Dərbəndi tutmaqla dövlətin şimal [24, s.84], 1510-cu il özbəkləri məğlub edib Ceyhun (Amudərya – E.N.) çayına qədər ərazisini genişləndirməklə şərq sərhədlərini müəyyənləşdirmiş oldu [6, s.51]. 1555-ci ildə Osmanlılarla imzalanan Amasya sülhü ilə də dövlətin qərb və şimal-qərb sərhəddi müəyyənləşdirildi. Ərəb-İraqı, Şərqi Anadoluda müəyyən ərazilərə sahib olan Səfəvilər Amasya sülhü ilə Bəsrə, Bağdad, Şəhrizor, Van, Bitlis, Qars və Atabəylər yurdunu Osmanlılara güzəştə getdilər [14, s.4]. Kaxetiya, Mosuk (Axıska-Borçalı), Kartli (Qori və Tiflis) [17, s.245], İrəvan əyalətlərinin idarəsi Səfəvilərdə qaldı [13, s.6]. Bu hüdudlara daxil edilən Xəzəryanı ərazilərin bir hissəsi-Dərbənddən başlayaraq, Quba, Şabran, Bakı, Salyan, Astara, Qaraağac (Talış), Gilan, Mazandaran və Astrabad ərazilərini əhatə edirdi. Xəzərin sahil xətlərinin ümumi uzunluğu 6840 km, adaların sahil xətlərini də nəzərə almaqla (740 km) 7580 km idi [32, s.117]. Xəzərin sahil xətlərinin təxminən 1700 km-i* Səfəvilərin nəzarəti altında olub Şirvan, Təbriz, Astrabad bəylərbəyilikləri, Gilan və Mazandaran məhəlli əmirlikləri** tərkibinə daxil idi. Bu inzibati ərazi vahidlərinin tərkibinə daxil olan Xəzəryanı mahal və ölkələr cədvəl 1-də öz əksini tapmışdır:

---

* Xəzər dənizinin sahil xəttinin uzunluğu Azərbaycan üzrə 900 km [32, s.51], İran İslam Respublikası üzrə 720 km [32, s.222], Dərbənd rayonun üzrə isə 50 km-dən çox idi.

** Şah I Abbas 1592-ci ildə Gilan, 1596-cı ildə isə Mazandaran məhəlli əmirliyini ləğv edib xassə əmlakına çevirdi və onların idarəsini qızılbaş hakimlərə tapşırdı [4, s.48].

**Cədvəl 1:** Səfəvilər dövlətinin Xəzəryanı ərazilərinin inzibati quruluşu

| № | Bəylərbəyilik və məhəlli əmirliklər | Xəzəryanı mahal və ölkələri[***] |
|---|---|---|
| 1 | Şirvan bəylərbəyiliyi | Dərbənd, Quba, Şabran, Badkubə (Bakı), Salyan, Mahmudabad mahalları |
| 2 | Təbriz bəylərbəyiliyi | Qaraağac (Talış), Astara mahalları |
| 3 | Gilan məhəlli əmirliyi | Kəskər, Kəhdom, Ranku və Tonekabon mahalları |
| 4 | Mazandaran məhəlli əmirliyi | - |
| 5 | Astrabad bəylərbəyiliyi | Gəraylı, Hacılar, Cəlayir eli ölkəsi, Qaraçöp və Səhra üzü bölüyü, Göklən və Yomut mahalları. |

Şirvan bəylərbəyiliyinin Dərbənd, Quba, Şabran, Badkubə (Bakı), Salyan, Mahmudabad mahallarının eyni adlı şəhərləri (Dərbənd, Quba, Badkubə, Salyan, Mahmudabad, o cümlədən Niyazabad şəhəri) Səfəvilər dövründə mühüm əhəmiyyət kəsb edirdi. Xüsusilə, Dərbənd, Bakı və Niyazabad iqtisadi, ticari və strateji əhəmiyyətli şəhərlər hesab olunurdu. Dərbənd şəhəri sədd ilə əhatə olunan liman şəhəri idi. XVI əsrdə Dərbənd şəhərinin əhali sayı ilə bağlı dəqiq məlumat olmasa da verilən rəqəmlər əsasında təxmini say müəyyənləşdirmək mümkündür. Dərbənd tarixini yazan Yevgeni Kozubski qeyd edir ki, "Şah I İsmayıl tərəfindən 1509-cu ildə şəhərdə Təbrizdən 500 Rumlu ailəsi... Şah I Təhmasib zamanında isə 1400 qorçu ailəsi məskunlaşdırılmışdı" [25, s.53-54]. Əgər bu məlumatı nəzərə alsaq XVI əsrin ilk yarısında Dərbənd şəhərində 1900 ailənin, təxminən 9500 nəfər əhalinin məskunlaşdırılması məlum olacaqdır. Bu köçlərə qədər şəhərin yerli əhalisinin sayının nə qədər olması barədə hər hansı bir məlumat yoxdur. Eynilə XVI əsrin sonlarında da yerli əhalinin sayı barədə hər hansı bir məlumata təsadüf etmirik. Mənbələr sadəcə qalada yerləşdirilən qızılbaş qarnizonunun məhvinə şahidlik edir. 1578-ci ildə Şirvana yürüşü zamanı İbrahim Rəhimizadə yazırdı ki,

[***] Səfəvilər dövründə "ölkə" ümumi termin olmaqla müxtəlif şərtlə müvəqqəti (xidmət dövründə), yaxud ömürlük verilən tiyulu, irsi sahibkarlıq və tam vergi immuniteti (maaf) hüquqi ilə verilən soyurqalı, nəhayət, vergi immuniteti olmadan idarə üçün verilən ərazini göstərir.

Dərbənd şəhərinin əhalisi qiyam qaldırıb şəhər hakimi Çıraq Xəlifəni həbs edərək bütün qızılbaşları (500 nəfər) məhv etmişdir [23, s.63]. Moskvadakı gürcü səfirinin 1586-ci ildə verdiyi məlumata görə, "Dərbənd möhkəmləndirilməmişdi və əhalisi yox idi" [25, s.54]. Bu kəşfiyyat məlumatının səhihliyi bir o qədər də inandırıcı görsənmir. Çünki 1578-1590-cı illərdə getmiş Səfəvi-Osmanlı müharibələri zamanı Dərbənd şəhərinin əhalisi gah bu, gah da digər tərəfə meyl etmişdir. Təbii ki, bu vəziyyət əhaliyə böyük zərər vermişdir. Bütün bunlara baxmayaraq, şəhərin osmanlılardan geri alınmasından sonra əhalinin vergilərdən azad edilməsi [28, s.75] və şəhərin qismən də olsa dirçəlməsi Dərbənddə yaşayışın davamlı olmasına dəlalət edir. Şah I Abbas şəhəri geri aldıqdan sonra sələfləri kimi Dərbəndi yeni köçürdüyü ailələrlə möhkəmləndirdi. Bayat tayfasından 400 ailə (təxminən 2000 nəfər) Fərhad bəyin rəhbərliyi ilə Dərbəndə yerləşdirildi [25, s.59]. XVII əsrin ortalarında şəhər əhalisinin sayında artım müşahidə olunurdu. Bu barədə 1647-ci ildə şəhərdə olan türk səyyahı Evliya Çələbi məlumat verir. İlk öncə qalanın geniş təsvirini verən səyyah onun ətraf çevrəsinin 11060 addım km* və ətrafında 7060 divarın olması barədə məlumat verir. Daha sonra isə yazırdı ki, "Qalanın içində təmiz torpaqla örtülmüş bağ-bağçasız 1200 ədəd qədim üslubda tikilmiş ev vardır. Qaladan bayırda...1000 ədəd gözəl evlər yerləşmişdir. Üç tərəfində bağ-bağçası çoxdur, amma yoxsullara yemək verən xeyriyyə evləri yoxdur. Cümə məscidi, karvansaray və bazarları çoxdur..." [5, s.116]. Mənbədən məlum olur ki, Dərbənd şəhərində XVII əsrin birinci yarısında cəmi 2200 ev vardı, yəni təxminən 11.000 nəfər əhali yaşayırdı. XVII əsrin ikinci yarısında holland səyyah Yan Streys Dərbəndlə bağlı yazırdı: "Dərbənd şəhəri üç hissəyə bölünür: yuxarı hissə 1000 nəfərə qədər etibarlı əsgərlə təmin olunmuş qarnizona malik sultanın iqamətgahı olan hissədir. Şəhərin orta hissəsi persiyalıların** yaşadığı, güclü dağıntılara məruz qalmışdır, aşağı hissə isə təxminən 2000 addım uzunluğundadır, evlər görünmür, sadəcə bağlar və əkin sahələri var. Burada heç vaxt yunanlar yaşamamışdır, lakin indi də Şəhri-Yunan, yaxud yunanların şəhəri adlanır" [33, s.222]. Holland səyyah yalnız şəhərin yuxarı hissəsindəki əhalinin, daha doğrusu qarnizon əsgərlərinin sayını göstərir. Çox güman ki, dağıntılara məruz qalan orta hissə əhali tərəfindən tərk edilmişdi. Ümumiyyətlə, XVIII əsrin əvvəllərində Dərbənd şəhərində Səfəvi şahlarının təyin etdiyi sultanın idarəçiliyi altında Gerberin 1728-ci ildə verdiyi təsvirə görə, 600 nəfər süvari və 1000 nəfər piyada qoşun vardı [22, s.85]. Lakin Dərbənd əhalisinin hamısı hərbi işi yaxşı bilirdi və lazım gəldikdə 5000-ə qədər döyüşçü toplanırdı [27, s.30]. Bu məlumatlardan aydın olur ki, XVIII əsrin ilk yarısında Dərbənd şəhərində əhali sayı ətraf kəndlərdə yaşayan əhali

* 1 addım 95 sm qəbul edildiyindən, 11060 addım 10,5 km-ə bərabərdir.
** Persiyalılar deyildikdə dövlətin aparıcı qüvvəsi olan qızılbaşlar nəzərdə tutulur.

ilə birgə təxminən 20.000 nəfər idi. Bunu 1770-ci ildə Dərbənddə olmuş Qmelinin məlumatı da təsdiqləyir. Onun məlumatına görə, Dərbənddə 4000 ailə (yaxud 20 min nəfər əhali) var idi [8, s.92]. Beləliklə, təqdim edilən məlumatlar əsasında Dərbənd şəhərində əhalinin say dinamikasını aşağıdakı kimi müəyyən etmək mümkündür (diaqram 1):

**Diaqram 1:** Dərbənd əhalisinin say dinamikası (min nəfərlə)




Şirvanın ən mühüm şəhərlərindən biri də Şabran idi. Şəhər Səfəvilər dövlətinin tənəzzülünə qədər öz mövqeyini qoruyub saxlamışdır. Şabran şəhəri ilə bağlı məlumat verən türk səyyahı Evliya Çələbi yazırdı ki, Dəmirqapı sərhədlərinə daxil edilmiş şəhər monqol yürüşləri vaxtı dağıdılsa da, sonra yenidən bərpa olunmuşdur. 1578-ci il III Muradın vəziri Özdəmirzadə Osman paşa həmin ildə Dəmirqapını fəth etdikdə Şabran şəhərinin bütün sünni əhalisi də ona itaət etmiş və bura sancaqbəyi mərkəzi olmuşdu. Təbrizdən sonra abu-havası baxımından məşhur olub, səyyahın səfəri zamanı da abad və baxımlı, miyanə bir şəhər idi. Cəmi 70 mehrab və 70 məhəllədən ibarət idi [5, s.110]. Səyyah əhali sayını göstərməsə də müqayisə üçün qeyd edək ki, Ərəşdə 40, Şamaxıda 26 məhəllə olduğu halda burada 70 məhəllə olması şəhərin kifayət qədər geniş və çoxsaylı əhaliyə malik olmasını deməyə əsas verir. Evliya Çələbinin Şamaxıdan bəhs edərkən "şəhər içrə 7000 abad ev" [5, s.101-102] olmasını qeyd etməsini həqiqət olaraq qəbul etsək səyyahın xatırladığı "böyük Şabran"da da azı bir neçə min ev, azı 10.000 əhali təxmini müəyyənləşdirmək mümkündür. Lakin Şirvanın digər şəhərləri kimi bu şəhər də hərbi əməliyyatlar nəticəsində xeyli ziyan görmüş, bəzi vaxtlarda köçürmələr hesabına möhkəmləndirilsə də artıq XVII əsrin ikinci yarısında tənəzzül dövrünü keçirmişdir. Bəzi tədqiqatçılar Şabran şəhərinin süqutunu 1669-cu ildə Stepan Razinin soyğunçu dəstəsinin şəhərdə talançılıq edib, əhalisinin çoxunu qırması ilə əlaqələndirirlər [1, s.86-87; 20, s.120-121]. Bu səbəbdəndir ki, artıq XVII əsrin 70-ci illərində Yan Streys Şabranı sadəcə "şəhərcik" hesab edirdi. XVII əsrin sonlarında isə, ümumiyyətlə bu şəhərin adına Azərbaycan şəhərləri

arasında rast gəlinmir [21, s.36]. XVIII əsrdə artıq kiçik mahala çevrilən Şabranın əhalisi getdikcə tamamilə tarix səhnəsindən silindi. M.Heydərova görə Şabran əhalisinin əsas hissəsi də ondan şimala doğru cəmisi 5 verst aralıda yerləşən Qubaya köçmüşdü [20, s.121].

Şirvanın ən mühüm şəhərlərindən biri də Bakı şəhəri idi. Səfəvilər hakimiyyətinin ilkin dövründə şəhər əhalisinin sayı ilə bağlı məlumata təsadüf olunmur. Sadəcə S.Aşurbəyli şəhərlə bağlı XVI əsr Azərbaycan tarixçiləri Xandəmir və Həsən bəy Rumlunun məlumatlarına əsaslanaraq qeyd edir ki, "O vaxt Bakı şəhəri alınmaz qala sayılırdı. O üçqat möhtəşəm divarla – bir tərəfdən dənizlə, quruda isə geniş və dərin xəndəklə əhatə olunmuşdu...şəhərin qalada yaşayan əhalisi 4-5 min nəfərdən çox deyildi. Şirvan bəylərbəyiliyinin mərkəzinin Şamaxı olmasına baxmayaraq, Bakı da mühüm ticarət və liman şəhəri idi [2, s.252].

Bakı şəhəri ilə bağlı daha ətraflı məlumatları dövrün səyyahlarının əsərlərin də izləmək mümkündür. Məsələn, Evliya Çələbi 1646-1647-ci illərdə Azərbaycana birinci səfəri zamanı Bakı şəhəri ilə bağlı yazırdı: "...dərya kənarındakı ərazisində minə qədər bağ-bağçası, cümə məscidi, karvansaray və hamamlı, şah bazarlı abad bir şəhərdir ki, üç tərəfi möhkəm dayanaqlı divarlarla əhatə olunmuşdur. ...Şəhər üç min əsgərə, on iki hakimə malikdir. Başqa qəzası və yeddi nahiyəsi vardır..." [5, s.106-107]. Evliya Çələbinin Bakı hakiminin 3000 əsgərə malik olması barədə məlumat verməsi ən azından şəhər və ətrafında yaşayan əhalinin sayının təqribən 15.000 nəfər olmasını ehtimal etməyə imkan verir. 1689-cu ildə Azərbaycanda olmuş fransız missioneri rahib Villet aşağıdakı məlumatı verir: "Persiyalıların (Səfəvilərin – E.N.) dövləti, yaxud imperiyası 16 böyük vilayətə bölünür. Onların hər birinin tabeliyində sultanlıqların, yəni əyalətlərin adı ilə sultan adlandırılan əyalət hakimləri olan xanları, yaxud şah canişinləri vardır. Şirvan dövlətindəki Bakı əyaləti onlardan biridir. Onun 34 kəndi var..." [34, s.97]. Göründüyü kimi, Bakı XVII əsrin sonlarında Səfəvilər dövlətinin coğrafi, iqtisadi və siyasi baxımdan mühüm inzibati vahidlərindən biri idi. Bakı şəhəri XVII əsrin 60-cı illərinin sonunda kazakların basqınlarına məruz qaldı. Bu basqınlar şəhərin sahilyanı məntəqələrində qətl və qarətlərlə müşahidə edildi [2, s.202]. Bu basqınlar sonrasında Bakıda qala istehkamlarının gücləndirilməsinə ehtiyac yarandı. Artıq 1701-1702-ci illərdə Bakıda qala istehkamları möhkəmləndirilmişdi [2, s.203]. Lakin bu tədbirlər XVIII əsrin əvvəllərində yaranan böhranlı vəziyyətlə əlaqədar yetərli bir səmərə vermədi. Lerx 1747-ci ildə ikinci dəfə Bakıda olarkən artıq şəhər həyatının tənəzzülə uğradığını qeyd etmişdi [2, s.294]. Xanlıq dövründə əhali sayının 6-7 min nəfər olması tənəzzülün hansı səviyyədə olmasını açıq-aşkar göstərir. Hətta 1821-ci ildə belə şəhər və ətrafı da daxil olmaqla əhali sayı ümumilikdə heç 20.000-ə qədər də çatmırdı [2, s.308-309].

**Diaqram 2:** Bakı şəhəri və ətrafının əhalisinin say dinamikası (min nəfərlə)




Şirvanın ən mühüm 3-cü liman şəhəri Niyazabad hesab olunurdu. Xaçmaz rayonu hüdudlarında olan bu şəhər hazırda kənddir. Evliya Çələbinin səyahətnaməsində Şabran şəhərinə bir mənzil məsafədə yerləşən böyük bir şəhər kimi xatırlanır. Osmanlı-Səfəvi müharibələrinin gedişində (1578-1590-cı illər), 1583-cü ildə Niyazabad şəhərinin qalası dağıdılmışdır. 40 mehrab və 40 məhəllə olan şəhər sultanlıq kimi qeyd olunur. E.Çələbi şəhərin kələntərinin məlumatına istinadən əhali sayını "6000 ev" [5, s.98], yəni təxminən 30.000 nəfər olaraq qeyd edirdi. Şəhərlə bağlı təsviri məlumatlar kifayət qədər olsa da [9, s.54-56; 11, s.26] XVIII əsrdə əhali sayı ilə bağlı hər hansı bir məlumat əldə etmək mümkün olmamışdır. Məlum olan şəhərin dağıntıya məruz qaldıqdan sonra bir daha əvvəlki əhəmiyyətini bərpa edə bilməməsidir [10, s.38].

Şirvan şəhərləri içərisində Hülaki hökmdarı Qazan xan tərəfindən Xəzər dənizi sahilində 1295-ci ildə salınmış Mahmudabad şəhəri Hülaki xanın dağıtmış olduğu Güştəsbi vilayəti və şəhərin əhalisinin buraya köçürülməsi ilə yaranmışdır [3, s.229]. Mahmudabad şəhərinin də daxil olduğu eyni adlı nahiyənin əhalisi barədə yenə də Evliya Çələbidən məlumat alırıq. Səyyahın "böyük bir çöldə 200 para abad", "hər kəndi bir böyük şəhərə bənzər qəsəbə" [5, s.96] kimi xatırladığı nahiyənin mərkəzi şəhəri barədə ayrıca məlumat verməsə də əhalinin etnik tərkibinə toxunmaqla əhalinin sayı barədə müəyyən təsəvvür formalaşdırır. Etnik baxımdan rəiyyət və əhalisinin göydolaq, tərəkəmə, moğol, boğol, qumuq, it-til və erməni tayfalarından ibarət olması barədə qeyd edən səyyah "it-til qövmünün əhali sayını 20.000 nəfər" göstərir [5, s.96]. Lakin bu say istər nahiyənin, istərsə də şəhərin əhali sayı barədə hər hansı bir nəticə çıxarmağa imkan vermir.

Bütövlükdə Şirvanın Xəzəryanı əhalisinin say dinamikasının 3-cü diaqramdakı kimi izləmək mümkündür:

**Diaqram 3:** Səfəvilər dövründə Şirvanın Xəzəryanı şəhər və şəhər ətrafı ərazilərin əhalisinin say dinamikası (min nəfərlə)




Şirvanın Xəzəryanı şəhərlərinin hər birinin əhalisinin etnik, dini və sosial tərkibi ilə bağlı ətraflı məlumat olmadığından ümumi şəkildə dəyərləndirmə aparmaq daha məqsədəuyğundur. Sosial tərkibinə görə, bütövlükdə şəhərlərin əhalisini 5 təbəqədə qruplaşdırmaq olar: 1) şəhərin dünyəvi feodal zadəganları; 2) ruhanilər; 3) tacirlər; 4) sənətkarlar; 5) şəhər əhalisinin digər təbəqələri-müflisləşmiş kəndlilər, qullar və i.a [2, s.252]. Dini və etnik tərkib baxımdan da əsasən eynilik müşahidə edilirdi. Əhali əsasən müsəlmanlardan və türk mənşəli əhalidən ibarət idi.

Səfəvilər dövlətinin apardığı məskunlaşdırma siyasətinə qədər "şərq tərəfdən İran və Turan qövmü, qərb tərəfdən Dəşti-Qıpçaq qövmü, Sarı irq (?), Sol'at (?), Krım və uğursuz rus tayfası arasında sədd olmuş Dərbəndin" [5, s.112] əhalisi ehtimal ki, türk mənşəli, xüsusilə də bayat tayfalarından ibarət idi. Şah I İsmayıl dövründə bayatların bu ərazidə məskunlaşdırılması isə sadəcə mövcud etnik dayağı daha da möhkəmləndirmək məqsədi daşımışdır. Türkman Rumlu tayfası da bu məqsədlə əvvəlcə Dərbənddə, zamanla da "Azərbaycan və Arran ərazisində möhkəmlənmişdi" [31, s.57]. Dini baxımdan əvvəlcə şafi (sünniliyin bir qolu) məzhəbindən olan müsəlmanlardan ibarət olan Dərbənd əhalisi dövlət tərəfindən həyata keçirilən məskunlaşdırmalara baxmayaraq hətta XVII əsrin ortalarında da əksərən "sünni və şafi məzhəbində olan müsəlmanlardan" ibarət idi [5, s.116]. Səyyah bununla belə bütövlükdə Dərbənddə ətraf kəndləri ilə birlikdə "9000 şahsevən"nin [5, s.114] olması barədə məlumat verirdi. Dərbəndin sosial tərkibi isə əvvəldə də qeyd etdiyimiz kimi əsasən hərb işini yaxşı bilən insanlardan ibarət idi. Evliyanın məlumatına görə, şəhərin "münşisi, kələntəri, darğası, yasavulu, qorçuağası, dizçökənağası, çiyyeyən ağası və 2000 dizçökən tülüngüsü (əsgəri – E.N.) ... cürbəcür sənətkarları (əksərən ipək toxuyanları), ...zireh düzəltməklə məşğul olan qumuq xalqı" [5, s.114, 116] vardı.

Dərbənd şəhəri kimi Şabran da əsasən türk-müsəlman əhalidən, xüsusilə Bayat tayfalarının sıx məskunlaşdığı yaşayış məntəqələrindən biri idi. Bunu hazırda Sincan-boyad, Uzunboyad kimi kənd adlarının qorunub saxlanılması da təsdiq edir. Şəhərin sosial tərkibi barədə mənbələrdən dolğun məlumat əldə etmək mümkün deyildir. Sadəcə E.Çələbinin məlumatlarından şəhərdə sənətkarlığın ayrı-ayrı sahələrini yüksək səviyyədə inkişaf etdiyi məlum olur [5, s.102, 110].

Niyazabad və Mahmudabad şəhərlərinin əhalisinin etnik tərkibi barədə hər hansı bir məlumat əldə etmək mümkün deyil. Bakı şəhərinin etnik baxımdan Səfəvilərə qədər əsasən tat və türk tayfalarından ibarət olması Abşeron toponimlərində öz təsdiqini tapır. Evliya Çələbi Bakı ilə Dərbənd arasındakı ərazidə tərəkəmələrin qışlaq yerlərinin olması barədə məlumat verir. O, yazır: "Bu (Bakı) qala ilə Dəmirqapı arası sahilboyu ilə dörd mənzildir. Aralarında Müşkir nahiyəsinin kəndləri vardır ki, hər bir kəndi bir abad qəsəbədir. Köçəri tərəkəmə qövmü qış vaxtı öz obaları ilə köç edər" [5, s.107]. Bu məlumat Bakı şəhəri ətrafı ərazilərin bir qisminin əsasən şimal-şərq bölgəsində yaşayan tərəkəmə tayfalar üçün bu ərazilərin qışlaq yeri olduğunu göstərir. Şirvanın Xəzəryanı ərazilərinin əhalisi ilə bağlı verilən məlumatlardan belə nəticəyə gəlmək olur ki, buranın əhalisinin etnik tərkibi əsasən türklərdən və müəyyən qədər də tatlardan ibarət idi. Təəssüf ki, mənbə yetərsizliyi səbəbindən əhalinin etnik tərkibini rəqəmlərlə ifadə etmək mümkün deyil.

Şirvandan fərqli olaraq Təbriz bəylərbəyiliyinə daxil olan Xəzəryanı şəhərlərin – Qaraağac, Astara və Lənkəranın əhalisinin sayı ilə bağlı məlumatların azlığı daha tutarlı fikir söyləməyə imkan vermir. XVII əsrdə qızılbaş hakim Sarı xana qarşı Talışda baş vermiş hərəkatda "30.000-ə yaxın kənd və şəhər əhalisinin iştirak" [7, s.10] etməsini nəzərə alsaq burada bütövlükdə əhalinin sayının 30.000 nəfər olduğunu təxmini qəbul edə bilərik. XVIII əsrin əvvəllərində Lənkəran və Astara barədə məlumat verən Artemi Volınski 1717-ci ildə "Astara şəhərində 50, Lənkəranda 200 evin" olması (təxminən 1250 nəfər əhali yaşaması) barədə məlumat verirdi [26, s.192]. Qeyd etmək lazımdır ki, bu rəqəmlər həddindən artıq kiçikdir və əhalinin sayı barədə reallığı əks etdirmir. Çox güman ki, A.Volınski bu şəhərlərin müəyyən hissəsinin əhalisini qeydə almışdır, yaxud da bölgənin əhalisi həmin dövrdə baş qaldıran böhran nəticəsində öz yaşayış yerlərini tərk edərək başqa ərazilərə köçmüşdür. Bu barədə də məlumatlarının yetərli olmaması nisbi rəqəmlərin müəyyən edilməsinə imkan vermir.

Qızılüzən çayı Gilanı iki hissəyə – 30 şəhəri birləşdirən mərkəzi Lahican şəhəri olan Biye-Piş və mərkəzi Rəşt şəhəri olan Biye-Pasa ayırır. Gilanın Xəzər sahilindəki ən mühüm şəhərlərindən biri Lahican hesab edilirdi. XVI

əsrin əvvəllərində Lahican* şəhərinin əhalisinin sayı barədə məlumat olmasa da, əsrin sonlarında bu haqda məlumat almaq mümkündür. Həmin dövrdə Oruc bəy bayat yazırdı ki, şəhərdə 70 min ev (yəni 350.000 nəfər – E.N.) vardır [29, s.31]. Digər məlumatların olmaması səbəbindən bu rəqəmi müqayisə etmək və sonrakı əsrlərdə əhalinin say dinamikasının necə dəyişdiyini izləmək mümkün deyildir. Ənzəli isə Xəzər sahillərində mühüm liman şəhərlərindən biri hesab edilirdi. Şəhər əhalisinin ümumi sayı barədə məlumat verməsə də, E.Çələbi yazır ki, təkcə Ənzəli hakimi "1000 nəfər nökərə sahib idi" [5, s.165]. Ənzəli əhalisinin etnik tərkibi isə əsasən giləklər, onlarla yanaşı türklər, talışlar və başqa xalqlardan ibarət olmuşdur.

Mərkəzi Astrabad şəhəri olan Astrabad bəylərbəyiliyi İsgəndər bəy Münşi-nin yazdığına görə, "...keçmiş vaxtlarda Cürcan və Təbəristan valilərinin əyləşdikləri yer idi... Bu vilayət bir tərəfdən Xəzər dəryasına birləşir..." [12, s.206, 1061]. 1510-cu ildə Səfəvi torpaqlarına qatılan bu əyalətdə [15, s.437] Oruc bəy Bayatın da təsvir etdiyi kimi 12 şəhər vardı. Astrabad bəylərbəyiliyinin mərkəzi hesab olunan Astrabadın əhalisi 50 min evdən (yaxud 250.000 nəfər – E.N.) çox idi [29, s.31]. Astrabad əyaləti əhalisinin, o cümlədən də şəhər əhalisinin əsas hisəsini türk Gəraylı tirəsi təşkil edirdi. Gəraylı obaları Xorasan ərazisinin də müxtəlif bölgələrdə məskun idilər. Boz Oxun Ağcalı oymağına bağlı olan Hacıların bir neçə obası isə Kəbud Məscid mahalında yaşayırdılar. Türkmən Qaraçöp obası, Göklən eli, Yomut eli də Astrabad vilayətində məskun olub, Göklən elinin ölkəsi Qorqanda, Yomut elinin ölkəsi isə Astrabadın şimal-şərqində idi" [31, s.170].

XVII əsrin əvvəllərində isə Astrabadın Qorqan çayı ətrafında qacarlar da məskunlaşdırılmışdı. Çayın aşağı və yuxarı hissəsində yerləşməsinə görə Yuxarıbaş və Aşağıbaş qacarlarına bölünürdülər. Qorqan çayının sağ, yuxarı sahilində yaşayanlar Yuxarıbaş və ya Dəvəlu, sol aşağı sahilində yaşayanlar isə Aşağıbaş, yaxud da Qoyunlu qacarları adlanırdı. Yuxarıbaş qacarları Dəvəlu, Sapanlı, Köhnəlu, Xəzinədarlu, Kayaklu və Kerlü adlanan altı obadan ibarət olub, ən nüfuzlu bəyləri Dəvəlu obasından idi. Aşağıbaş qacarlar da Qoyunlu, İzzəddinli, Şam Bayatı, Qara Musanlu, Vaşlu (Aşlu) və Ziyadlu adlanan 6 obadan ibarət idilər. Bu qolun da ən nüfuzlu obası Qoyunlular idi [18, s.51]. Bu obaların hamısı türkmanlar idi. Astrabadda sadaladığımız ellərin və obaların say nisbətini müəyyənləşdirmək bu barədə hər hansı bir məlumat olmadığına görə mümkün deyil.

Xəzərin cənub sahillərində – Gilan və Astrabad arasında Mazandaran əyaləti yerləşir. Bu əyalətin mərkəzi hesab edilən Mazandaran şəhərinin əhalisinin sayını 50.000 evdən (təqribən 250.000 nəfər – E.N.) ibarət olduğunu qeyd edən Oruc bəy Bayatdan [29, s.31] savayı digər məlumat əldə etmək

* Lahican – qədim fars dilində ipək məkanı anlamındadır [bax: 32,51].

mümkün olmamışdır. Bu səbəbdən də Səfəvilər dövründə şəhərin əhalisinin sayının necə dəyişdiyini izləmək mümkün deyildir. Şəhərin əhalisi etnik baxımdan əsasən iran dilli tayfalardan ibarət olmuşdur. Onlardan savayı, Qarabağın Otuziki, Qazaxlar, Şəmsəddinli türk oymaqlarından* xeyli əhali, o cümlədən də digər müsəlman və qeyri-müsəlman əhalinin bir hissəsi Mazandarandakı Fərəhabadda məskunlaşdırılmışdır. 1612-ci ildə baş tutan bu məskunlaşdırma siyasəti nəticəsində 15.000 yaxın ailə (təqribən 75.000 nəfər – E.N.) Mazandaranda və ətraf ərazilərdə məskunlaşdırıldı. Şah I Abbasın bu siyasəti əslində sadəcə cəzalandırmaq deyil, həm də dövlətin təhlükəsizliyini təmin etmək məqsədi daşıyırdı [19, s.153-154]. Bu qeyri-müsəlman əhalinin içərisində gürcü və çərkəz əsirlər də vardı. Oberlinq Tomas Herbertə istinadən bu barədə məlumat verərək, çərkəzlərin sayını gürcülərlə birgə 40.000 nəfər olaraq göstərirdi [30, s.140]. Lakin köçürülən qeyri-müsəlman əhali islamı qəbul etsə də dilini və mədəniyyətini hazırda da qoruyub yaşatmaqdadır.

**Diaqram 4:** Səfəvilər dövründə Xəzəryanı şəhərlərin və ətrafının say dinamikası (min nəfərlə)




Bütövlükdə, Xəzəryanı ərazilərə məxsus şəhərlərin və ətrafının əhalisinin dini tərkibinə nəzər saldıqda, əsasən müsəlman əhalidən ibarət olması qənaətinə gəlmək mümkündür. Tədqiqatın nəticəsində, hətta köçürülən qeyri-müsəlman əhalinin də (gürcü və çərkəzlərin – E.N.) sonradan müsəlman olması məlum olur. Eyni zamanda etnik baxımdan da rəngarənglik mövcud idi. Xəzərsahili boyu – Dərbənddən Astrabada qədər daha çox türk mənşəli əhalinin, onlarla yanaşı tatlar, talışlar, giləklər, mazandaranlılar, hətta sonradan məskunlaşdırılan gürcü və çərkəzlərin də yaşadığını izləmək mümkündür.

* Bu oymaqların əhalisinə Osmanlı xidmətinə girdiyinə görə, Səfəvilər tərəfindən dönük adı verilmişdir.

Təəssüf ki, məlumatların azlığı əhalinin etnik tərkibini say baxımdan dəqiqləşdirməyə imkan yaratmır. Səfəvilər dövründə Xəzəryanı şəhərlərin onlara bağlı ərazilərin say dinamikasını aid olduğu inzibati vahidlərə uyğun olaraq 4-cü diaqramda izləmək mümkündür.

## ƏDƏBİYYAT

1. *Abbasova F.Ə.* Şabran: (tarixi-arxeoloji tədqiqat).Bakı: Elm, 2002, 280 s.

2. *Aşurbəyli S.B.* Bakı şəhərinin tarixi (Orta əsrlər dövrü). Bakı: Avrasiya press, 2006, 416 s.

3. *Aşurbəyli S.B.* Şirvanşahlar dövləti. Bakı: Avrasiya press, 2006, 416 s.

4. *Bayramlı Z.H.* Azərbaycan Səfəvi dövlətinin quruluşu və idarə olunmasında türk qızılbaş əyanlarının rolu. Bakı: Avropa, 2015, 348 s.

5. *Çələbi E.* "Səyahətnaməsi"ndə Azərbaycan. (nəşrə hazırlayan Mehmet Rıhtım). Bakı: Qafqaz Universiteti nəşriyyatı, 2012, 296 s.

6. *Əfəndiyev O.Ə.* Azərbaycan Səfəvilər dövləti. Bakı: Şərq-qərb, 2007, 344 s+8 s.

7. *Əsədov F.S.* Talış xanlığı. Bakı: Çənlibel, 1998, 152 s.

8. *Hacıyev A.A.* Dərbənd əhalisinin say dinamikası (XVIII əsrin sonu-XX əsrin əvvəlləri)// Pedaqoji Universitet xəbərləri. Bakı, 2008, №3, s. 92-99.

9. *Xudiyev N.M.* Seçilmiş əsərləri. XI c. Xaçmaz. Bakı: Elm və Təhsil, 2014, 474 s.

10. *İbişov S.* Quba xanlığı: əhali tarixi və azadlıq mücadiləsi. Bakı: Elm, 2012, 336 s.

11. *İdrisov Q.S.* Xaçmaz toponimləri. Bakı: Şərq-Qərb, 2011, 104 s.+ 16 s.

12. *Münşi Türkman İ.* Dünyanı bəzəyən Abbasın tarixi (Tarixe-aləmaraye-Abbasi). Fars dilindən çevirən: tarix elmləri doktoru, professor Şahin Fərzəliyev (Şahin Fazil). Bakı: Şərq-Qərb Nəşriyyat evi, 2010, 1144 s.

13. *Babacan H.* 1590 (H.999) tarihli tahrir defteri'ne göre Revan kazası. Yüksek lisans tezi. Samsun: 1994, 153 s.

14. *İslam Ansiklopedisi.* 44 ciltte. C. 3. İstanbul: Türkiye Diyanet Vakfı, 1991, 559 s.

15. *İslam Ansiklopedisi.* 44 ciltte. C.11. İstanbul: Türkiye Diyanet Vakfı, 1995, 552 s.

16. *İslam Ansiklopedisi.* 44 ciltte. C.27. İstanbul: Türkiye Diyanet Vakfı, 1995, 592 s.

17. Kırzıoğlu M.F. Osmanlılar'ın Kafkas - Elləri'ni fethi (1451-1590). 2. Baskı. Ankara: Türk Tarih Kurumu Basımevi, 1998, 550 s.

18. *Sümer F.* Kaçarlar/Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, Cilt: XXIV. İstanbul: 2001, s.51-53

19. *Sümer F.* Safevi devletinin kuruluşu ve gelişmesinde Anadolu türklerinin rolü. Ankara: Güven Matbaası, 1976, 265 s.

20. *Гейдаров М.Х.* Города и городское ремесло Азербайджана XIII-XVII веков. Ремесло и ремесленные центры. Баку: Элм, 1982, 283 с.

21. *Гейдаров М.Х.* Ремесленное производство в городах Азербайджана в XVII в. Баку: Издательство Академии Наук Азербайджанской ССР, 1967, 200 с.

22. *Гербер И.Г.* Описание стран и народов вдоль Западного берега Каспийского моря. 1728, В кн. История, география и этнография Дагестана, XVIII-XIX вв. (архивные материалы). Москва, Изд. восточной литературы, 1958, с. 60-118

23. *Гусейн Ф.* Османо-сефевидская война 1578-1590 г. Баку:Нурлан, 2005, 216 с.

24. *Касумов Н.К.* Дербент-Ворота Кавказа. Дербент: Издательство ОАО «Типография №3», 2007, 480 с.

25. *Козубский Е.И.* История города Дербента. Темиръ-Ханъ-Шура: Русская типография В.М.Сорокина. 1906, 468 с, с 26 рисунками.

26. *Курукин И.В.* Персидский поход Петра Великого. Низовой корпус на берегах Каспия (1722-1735). М.: Квадрига; Объединенная редакция МВД России, 2010, 381 с.

27. *Лопухин А.И.* Журнал путешествие через Дагестан, 1718г. В кн. История, география и этнография Дагестана, XVIII-XIX вв. (архивные материалы), Москва, Изд. восточной литературы, 1958, с. 6-58.

28. *Рахмани А.А.* Азербайджан в конце XVI и в XVII веке (1590-1700 годы). Баку: Элм, 1981, 238 с.

29. *Россия и Европа глазами Орудж‑Бека Баята – Дон Жуана Персидского.* Перевод с английского, введение у комментарии и указатели Октая Эфендиева и Акифа Фарзалиева. СПб: Издательство Санкт-Петербургского университета, 2007, 211 с.

30. *Oberling P.* Georgians and Circassians in Iran/ Studia Caucasica, 1, 1963, pp. 127-143.

31. *Tadhkirat al-muluk*. A manual of Safavid Administration (circa 1137/ 1725). Persian text in Facsimile (B.M. Or. 94-96). Translated and explained by V. Minorsky. London: printed by W. Heffer & Sons, 1943, 360 p.

32. *The Caspian Sea Encyclopedia.* London-New-York: Springer-Verlag Berlin Heidelberg, 2010, 537 p.

33. *Les Voyages de Jean Struys, En Moscovie, en Tartarie, en Perse, aux Indes,* & en plusieurs, autres pais etrangers. Amstredam, Ches la Veuve de Jacob van Meurs. MDCLXXXI (1681), 568 p.

34. *Voyages d'un missionnaire de la Compagnie de Jésus en Turquie*, en Perse, en Arménie, en Arabie et en Barbarie. Chez Jacques Vincent, A Paris 1730, 647 p.